Azerbaijan School, Volume 320, Issue 1, pp.35-48, 2013

(***English***)

## THOUGHTS ON THE CONTEXT OF TEACHER PREPARATION

**U.Mammadov**

**Abstract**. In the article general problems of teacher preparation is commented. The basic factors in teacher preparation are analyzed. It is noted that teacher preparation should meet the demands of existing requirement and base on achieved practice and legal documents

(***Azerbaijan***)

## İLKİN MÜƏLLİM HAZIRLIĞI KONTEKSTİNDƏ. MÜLAHİZƏLƏR, FİKİRLƏR

**Yusif Məmmədov**

*Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru,*
*AMEA-nın müxbir üzvü, fizika-riyaziyyat elmləri doktoru, professor, Fasiləsiz Pedaqoji Təhsil üzrə Koordinasiya Şurasının sədri*

**Açar sözlər**. *Müəllim, kontekst, fikirlər, mühazirələr, pedaqogika.*

(***Russian***)

## СООБРАЖЕНИИ МНЕНИЯ В КОНТЕКСТЕ НАЧАЛЬНОЙ ПОДГОТОВКИ УЧИТЕЛЯ

**Ю.Мамедов**

В статье интерпретируются общие подготовки учителя. Анализируются обуслаливающие факторы подготовки учителя, сылаясь на практику, существующим нормативно - юридическим документам, а также требованиям современности.

Azerbaijan School, Volume 320, Issue 1, pp.35-48, 2013

Bəşəriyyət öyrənmək, tərbiyə etmək barədə düşündüyü zamanlarda müəllim haqqında da fikirləşməyə başladı. Müəllim anlayışı yarandı. Zaman-zaman müəllim şəxsiyyətinin cəmiyyətdəki statusu formalaşdı. Müəllim haqqında tələblər müxtəlif zaman kəsiyində eyni olmasa da, onun yeni formalaşmaqda olan gənc nəsillərin inkişafını istiqamətləndirməsi, onlara elm, bilik öyrətməsi funksiyası dəyişmədi. Bu, müəllimi, müəllim şəxsiyyətini insanların nəzərində bəşəriyyətin fövqünə qaldırdı. Ona ziya saçan bir varlıq, ideal şəxs kimi yüksək qiymət verildi. Təsadüfi deyil ki, "Böyük didaktika"nın müəllifi Y.Komenski müəllimi günəşə bənzədirdi.

Lakin zaman keçdikcə müəllim şəxsiyyətində daha ciddi məqamlar dəyərləndirildi. Kimin müəllim olacağı barədə fikirlər söylənildi: hər kəs, hər öyrədən müəllim olmaz. Böyük ərəb mütəfəkkiri İbn Xəldunun təbirincə demiş olsaq, "Hər öyrədən müəllim deyil, kimdən öyrənirsənsə, müəllim odur".

Ötən əsrin sovet dönəmində də cəmiyyətin aparıcı qüvvələrindən biri olan müəllimə xüsusi diqqət yetirildi. Uşaq şəxsiyyətinin formalaşmasında onun rolu inzibati bir təhsil sisteminin aparıcı qüvvəsi kimi şərh olunurdu. Müəllimin öyrədici funksiyası monoloji yanaşma tərzi kimi inzibati sinif-dərs şəraitində izah edilirdi. Hətta pedaqogika müəllim və şagirdin subyekt-obyekt müstəvisində qurulan münasibətlər şəraitində müxtəlif cür cəza üsulları müəyyənləşdirmişdi. Həmin cəzaları məktəb, onun səlahiyyətli müəllimləri yerinə yetirirdi.

Elm öyrədən, yol göstərən, uşaqlara yüksək əxlaqi-mənəvi keyfiyyətlər aşılayan müəllimin onları haqlı və haqsız cəzalandırması heç də həmişə müsbət qarşılanmırdı. Bütün hallarda sinifdə bir müəllim xofunun dolaşması ilə nəticələnirdi ki, bu da uşaqların müstəqil və sərbəst düşünmələrində bir maneəyə çevrilirdi. Əlbəttə, bu, qədim və orta əsrlərin müsəlman məktəblərindəki falaqqa rejimi ilə eyni olmasa da, öz zamanı kontekstində inzibati bir cəza kimi mahiyyət etibarilə ondan o qədər də fərqlənmirdi.

Azərbaycanın müstəqilliyi onun iqtisadi, siyasi, mədəni sahələrdəki nailiyyətləri ilə yanaşı, təhsildə də böyük dəyişikliklərin aparılmasına rəvac verdi. Demokratik və humanist prinsiplər əsasında qurulan Azərbaycan təhsilində müəllimə, onun inkişafına xüsusi önəm verildi. Müstəqil Azərbaycanın qurucusu ulu öndər Heydər Əliyev cəmiyyətin inkişafında müəllimin əvəzsiz rolunu yüksək qiymətləndirirdi: "Mən müəllimdən yüksək ad tanımıram". Doğrudan da, müəllim nəsillərimizin yol göstərəni, tərbiyə edəni, elm, bilik öyrədəni bütün adlardan yüksəkdə olmaqla fərqlənir.

Artıq 1999-cu ildən həyata keçirilən təhsil islahatları müstəqil Azərbaycanın təhsili sahəsində quruculuq işlərinin aparılmasına yönəldilmişdir. Təhsil ictimai bir fenomen kimi cəmiyyətin bütün həyat şəraitinə nüfuz etməklə həm də ondan asılı olan, onun tələblərinə uyğun olaraq qurulan bir sistemdir. Quruculuq illərində məsələyə bu yöndə yanaşmaqla yanaşı, həm də təhsilin sosial bir dəyər, nəticə kimi qiymətləndirilməsi, tədris, təlim və tərbiyəyə dair fəaliyyətlərin məcmusundan ibarət olan proses kimi ona dəyər verilməsi

üstün hesab edildi. Təhsilin cəmiyyətin formalaşması mexanizmlərinin cəmi kimi funksiyaları dəyişdi. Yalnız şəxsiyyətə yönəlmiş təhsil insanın dinamik dəyişən, ictimai və iqtisadi həyatın tələblərinə cavab verən bir şəxsiyyət kimi inkişaf etməsinə imkan yarada bilər. Bu isə o deməkdir ki, təhsil öz xarakterinə görə elmyönümlü, bilikyönümlü olmaqla bərabər, şəxsiyyətyönümlü olmalı, insanların şəxsiyyət kimi formalaşmasına xidmət göstərməlidir.

Heç şübhəsiz, cəmiyyətdəki inkişaf təhsil mexanizmlərinin düzgün qurulmasından asılıdır. Konkret mənada təhsil özünün nailiyyətlərinə görə həmişə müəllim şəxsiyyətinə daha çox borcludur.

Müəllimin nüfuzu, qabiliyyətləri, bütövlükdə bir peşəkar insan kimi şəxsiyyəti necə formalaşır? Hazırkı şəraitdə buna necə nail olmaq mümkündür?

Məlum olduğu kimi, bu günün müəllimi öz zamanının peşəkarıdır. O, əsrlərin dolayından keçib gələrək bu adı saxlasa da, hazırkı dövrün tələbləri səviyyəsində bacarıqlara sahib olmalı və özünün fəaliyyətini müasir zamanın texniki tərəqqisinə uyğunlaşdırmalıdır. Əks halda o, cəmiyyətin sosial sifarişinə cavab verə bilməz. Ona görə də müəllim hazırlığında, xüsusən ilkin müəllim hazırlığında aparılan işlər ardıcıl və sistemli olmalı, elmi-pedaqoji araşdırmalara əsaslanmalıdır. Yaxşı haldır ki, təhsil islahatı dövründə həyata keçirilən mühüm tədbirlərdən biri də müəllim hazırlığı ilə bağlı olmuşdur. Nəticədə həmin araşdırmaların nəticəsi ümumiləşdirilmiş, ölkə üçün zəruri olan normativ-hüquqi sənəd hazırlanmışdır. 2007-ci il iyunun 25-də təsdiq olunmuş “Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının Konsepsiya və Strategiyası” adlı bu sənəd 4 hissədən ibarət olmaqla problem baxımından real vəziyyəti, strateji fəaliyyət istiqamətlərini, fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığı konsepsiyasını, eləcə də strategiya və konsepsiyanın həyata keçirilməsi üçün tədbirləri və fəaliyyət planlarını əhatə edir. Burada xüsusi olaraq müəllim hazırlığının nəzəri-pedaqoji əsasları ilə bağlı elmi əhəmiyyət daşıyan materiallar verilir [1].

Bununla yanaşı, 2010-cu il iyunun 3-də “Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları (kurikulumları)” sənədi təsdiq olunaraq istifadəyə verilir. Bu sənəddə təhsilverənlərin keyfiyyət göstəriciləri öz əksini tapır [2].

Bu sənədlər pedaqoji, xüsusilə müəllim kadrları probleminin həll olunması baxımından əhəmiyyət daşıyan normativ-hüquqi bazanı təşkil edir. Müəllimlərin hazırlanması, peşəkarlığı baxımından onların dəyərləndirilməsi üçün bu sənədlərə istinad etmək məqsədəmüvafiqdir. Eyni zamanda bu sənədlər həm də pedaqoji aspektdə ümumi fəaliyyətləri istiqamətləndirən sənədlərdir.

Təcrübədə isə müxtəlif fənn müəllimlərinin hazırlanmasında bir-birinə bənzəməyən xüsusiyyətlərlə rastlaşmaq olur. Bu xüsusiyyətlər, ilk növbədə, fənlərin spesifikliyi ilə xarakterizə edilir ki, müəllim hazırlığında bu, diqqət yetirilməli vacib şərtlərdən hesab olunur. Bu xüsusiyyətlər isə hər bir fənnin tədrisi metodikası elminin obyektinə aiddir. Ona görə də hər fənn üzrə müəllim kadrlarının hazırlanmasının nəzəri-metodik əsaslarını öyrənmək üçün araşdırmaların aparılmasına ehtiyac vardır. Söz yox ki, belə tədqiqatların aparılması problemlərin həll olunmasını praktik yöndə istiqamətləndirməklə yanaşı, həm

də nəzəri cəhətdən əhəmiyyət daşıyır və metodika elmlərinin formalaşması və inkişafına təkan verir.

Bu gün ilkin müəllim hazırlığında onun məzmunu vacib komponentlərdən hesab edilir.

İlkin müəllim hazırlığının məzmunu qüvvədə olan tədris planında öz əksini tapmışdır. Aparılan araşdırmalar da ilkin müəllim hazırlığının məzmununun yüklü olduğunu təsdiq edir. Orada tələbələrə praktik əhəmiyyəti, gələcəkdə müəllim işləyərkən faydası olmayan fənlər tədris olunur. Başqa sözlə, “... pedaqoji strukturlar hələ də müasir standartlara uyğun qabiliyyətlərin formalaşmasına deyil, əsas biliyin verilməsinə istiqamətlənmişdir” [1]. Ona görə də nəticədə yüklülük yaranmışdır.

Vəziyyətin belə olması, ilk növbədə, mövcud vəziyyəti yenə də araşdırmaqla reallığın üzə çıxarılmasını tələb edir. Hazırda ümumtəhsil məktəblərinin I-XI sinifləri üçün təhsil proqramları (kurikulumları) təsdiq olunaraq məktəblərin istifadəsinə verilmişdir. Müəllimlər həmin sənədlər əsasında işləməklə yanaşı, həm də onların xüsusiyyətlərini izah etməyi bacarmalıdırlar. Daha doğrusu, səriştəli çıxışlar etməklə, dərslərini peşəkarcasına aparmaqla diqqəti cəlb etməlidirlər. Lakin təəssüflə qeyd etmək lazımdır ki, bütün müəllimlər belə peşəkarlığı göstərməkdə çətinlik çəkirlər. Çünki onların bu məsələlər barəsində baza bilikləri yoxdur. Onlar həmin məsələləri nə pedaqogikadan ümumi məsələ kimi öyrənir, nə də tədris etdikləri fənnin metodikasında bu məsələlər barədə məlumat alırlar. Orta məktəbin təhsil proqramları (kurikulumları) ilə pedaqoji kadr hazırlayan təhsil müəssisələrinin təhsil proqramı (kurikulumu) arasında varislik əlaqələri pozulur. Bu proses ali təhsil müəssisəsində ümumi təhsil pilləsi üçün yararlı olmayan kadrların təhsili başa vuraraq məktəbə göndərilmələri ilə nəticələnir.

Son araşdırmalarda və normativ-hüquqi sənədlərdə müəllim hazırlığında onların bacarıqları aşağıdakı amillərlə təyin olunur:

“– metodoloji (pedaqoji-psixoloji) bacarıqlar;

– ümumi mədəni səviyyəni əks etdirən bacarıqlar;

– fənyönümlü bacarıqlar”.

İlkin yanaşmada yuxarıda göstərilən üç istiqamətin hər biri üzrə bacarıqlar (nəticələr) işlənməlidir. Həmin bacarıqların reallaşdırılması üçün fənlər müəyyənləşdirilməli, daha sonra fənlərin standartları hazırlanmalıdır. Bu zaman birmənalı şəkildə fənlərin uyğun inteqrasiya imkanları müəyyənləşdirilərək fənn proqramlarına (kurikulumlara) daxil edilməlidir.

Nəticələrin hazırlanması pedaqoji fəaliyyətin düzgün qurulmasına, müəllimin addım-addım problemin həllinə yaxınlaşmasına təkan verir. Eyni zamanda müəllimin dərs dediyi şagirdlərin inkişafını izləməsinə imkan yaradır.

Cəmiyyətdə yaranmış olan müəllim obrazı humanizmin, insanpərvərliyin təntənəsini yaradan, əməllərinin nəticəsindən həzz alan və gənclik üçün daim nümunə olan

bir sənət adamının ifadəsidir. Biz tarix boyu bu həqiqətlə yaşadığımız kimi, günümüzün reallıqlarında da onun şahidi oluruq. Müəllim uşaq aləminin sehrinə düşməklə yanaşı, həm də özünün ecazkar bir dünyasını yaratmaqla ətrafındakı insanların diqqətini cəlb edə bilir. Əxlaqi-mənəvi dünyanın sirli-sehrli bir insanı kimi qibtə, maraq obyektinə çevrilir. Çox vaxt uşaqlar onların nitqinə, hərəkətlərinə, yaxud geyiminə heyranlıqla diqqət yetirir, ondan nümunə götürməyə çalışırlar. Hətta bu heyranlıq içərisində müəllimin bir insan kimi şəxsiyyətində olan çatışmazlıqlar əriyir, görünməz olur. Uşaqlar bəzən müəllimin şəxsi keyfiyyətlərindəki bəzi cəhətləri ideallaşdıraraq öz münasibətlərinin fövqünə qaldırır, onu daha böyük həvəs və vurğunluqla təkrarlamağa çalışırlar. Əslində, bunlar bir şagird marağının təzahürü, görüntüsü olsa da, müəllim-şagird münasibətlərində ən ülvi, təmiz və həm də böyük məhəbbətin aydın parıltısı kimi nəzərə çarpır.

Cəmiyyətin müəllim amilinə daim ehtiyac duyması, onun qayğı və göstərişlərindən bəhrələnməsi həm də cəmiyyət üçün müəllimin əvəzolunmazlığı tezisini meydana çıxarır.

Ardıcıl olaraq davam edən cəmiyyət-müəllim münasibətləri ziqzaqında cəmiyyətin tələbatları meydana çıxdıqca müəllimlərin zəruri olan vacib qabiliyyətləri yaranır. Tələbatlarla qabiliyyətlərin uyğunluğu xüsusi bir harmoniya yaradır ki, belə bir situasiyada təhsil özünün maraqlılığı və qeyri-adi imkanları ilə daha çox maraq doğurur. Beləliklə, daha aydın şəkildə demək olar ki, müəllim kadrlarının sifarişi, geniş mənada, cəmiyyətdən, onun bütün zümrələrindən gəlir.

Dar mənada isə müəllim kadrlarının sifarişi məktəbdən, sinif otaqlarından, orada təhsil alan uşaqların düşüncə tərzindən, maraq dairəsindən gəlir. Odur ki, müəllim şəxsiyyətindəki əlamətlər həm də məktəbi təmin etməli, uşaqların zövqünə, maraq dairəsinə uyğun olmalıdır.

Bu gün insanlar zamanın məlumat şırnağında yaşayır. Hər an, hər dəqiqə həndəsi silsilə ilə artan fakt və hadisələr məkanında doğulub-böyüyən uşaqların tələbatları da artır. Çünki onlar çox bilir və daha geniş məlumatlara malik olurlar. Belə bir zamanda müəllimin məsuliyyət yükü artır. Müəllimlər uşaqları maraqlandırmaq, təəccübləndirmək üçün, nə az, nə çox, onları qabaqlamağa məcbur olurlar. Bu, müəllimin təşkil etdiyi dərs prosesinin ən vacib amili kimi qarşılıqlı ünsiyyətin, öyrənmə ünsiyyətinin yaranmasında bir vasitə olur. Müəllim bu vasitədən istifadə etməklə şagirdlərinin öyrənmə fəaliyyətini daha səmərəli qura, müəyyən nəticələrə nail ola bilər.

Bütün bunların daha uğurlu alınması müəllimin, ilk növbədə, ixtisasını dərindən bilməsini tələb edir. Həm də bu biliklərə dinamik yanaşmağı, onları ardıcıl və sistemli olaraq inkişaf etdirməyi mühüm bir vəzifə kimi qarşıya qoyur.

Müəllimin potensial bilikləri ilə yanaşı, onun peşəkarlığı da çox vacib olan bir şərt kimi dəyərləndirilir. Səriştəli olmaq, apardığı pedaqoji işi böyük ustalıqla həyata keçirmək zəruri keyfiyyətlərdən hesab olunur. Təcrübələr də onu göstərir ki, daha peşəkar, işinin ustası olan müəllimlər həm səmərəli nəticələrə gəlməkdə başqalarından fərqlənir, həm də onlar müəllim kollektivi arasında işinin bilicisi, ustası kimi nüfuz qazanırlar. Təhsil prosesində belə nüfuzun yaranması, əldə olunması çox hallarda müəllim-şagird münasibətlərinin uğurlu başlanğıcına çevrilir.

Azerbaijan School, Volume 320, Issue 1, pp.35-48, 2013

Pedaqoji prosesin səmərəliliyi pedaqoji ünsiyyətin düzgün qurulmasından asılı olur. Əksinə demiş olsaq, pedaqoji ünsiyyət pedaqoji prosesin əsasını təşkil etməklə, ilk növbədə, motiv (təlim marağı) yaradır. Bu münasibətin əmələ gəlməsində isə müəllimin uşaqlara olan məhəbbəti, sevgisi potensial qüvvə kimi çıxış edir.

Müəllim bütün qüvvə və imkanını səfərbər etməklə uşağın məhəbbətini qazanmağa çalışmalıdır. Onu ülvi, pak bir varlıq kimi dəyərləndirməklə özünün tövsiyələrini, qayğı və məhəbbətini uşaqlara yönəltməlidir. Bu cür münasibətləri o zaman yaratmaq mümkün olur ki, pedaqoji prosesə humanist prizmadan yanaşılsın, uşaqların fəaliyyətinə sərbəstlik verilsin, onların hissi və məntiqi idrakının inkişafına imkan yaradılsın.

Müasir zamanda elmin, təhsilin inkişaf etdiyi, texnologiyaların yüksək zirvəyə çatdığı və informasiyaların həddindən artıq bol olduğu bir vaxtda müəllim özünə, fəaliyyətinə necə münasibət bəsləməlidir? Verilmiş göstərişləri, tövsiyələri yerinə yetirməyə səy göstərməli, yoxsa təhsilin prioritet istiqamətləri fonunda fəaliyyətini qurmalı, müəyyən olunmuş təhsil standartlarının reallaşdırılmasında özü üçün mexanizmlər arayıb-axtarmalı və onları yaradıcı insan kimi həyata keçirməlidir? Əlbəttə, bu ritorik suallara cavab tapmaq üçün, ilk növbədə, müasir dövrün özünəməxsusluğu, tələb və ehtiyacları əsas amil kimi çıxış edir.

XXI əsrin sürətli inkişafı istər iqtisadiyyatda, istərsə də siyasi və mədəni aləmdə böyük dəyişikliklərin baş verməsi ilə müşayiət olunur. İnformasiyaların sürətlə çoxaldığı bir şəraitdə cəmiyyətin bütün sahələrində yaradıcı və qurucu fəaliyyətləri daha səmərəli təşkil etmək problemi yaranır. Hər kəs özünün mövqeyindən bu qlobal dəyişikliklərin fəal iştirakçısına çevrilməli olur. Belə cəmiyyətdə müəllimin funksiyası daha çox artır. O, dəyişən və inkişaf edən bir dövrün insanlarının formalaşdırılması ilə məşğul olan bir peşə adamı kimi daha çox məsuliyyət daşımalı olur. Ona görə də onun ümumi potensialı daha yüksək, fəaliyyət dairəsi daha geniş olmalıdır. O, özünün bütün yanaşmalarında səriştəli və nümunəvi bir peşə adamı kimi çıxış etməli, təlim-tərbiyəsi ilə məşğul olduğu insanları öyrənməyə, yaradıcı fəaliyyətə sövq etməlidir. Ən başlıcası, müasir texnologiyaları mənimsəməli və öz işinin mexanizminə çevirməlidir. Xüsusən informasiya-kommunikasiya texnologiyalarından peşəkarlıqla istifadə etməyi bacarmalıdır. Bu gün, demək olar ki, hər bir təhsilalanın, öyrənənin İKT-dən istifadə edə bilməsi, onun fəaliyyət imkanlarına bələdliyi müəllimdən bu bacarıqlara daha üstün səviyyədə malik olmasını tələb edir.

Böyük pedaqoqlarımız müəllim haqqında danışarkən onu həm də bir sənət adamı kimi dəyərləndirib. Onun peşəkarlığında aktyorluq elementlərinin, eləcə də dərs dediyi insanların maraq və diqqətini cəlb etmək üçün bir incəsənət adamına xas olan keyfiyyətlərin olmasını vacib hesab ediblər. Əlbəttə, bu, zaman-zaman informasiyaların, sənətin və sənətkarlığın yayılması imkanlarının məhdud olduğu dövrlərdə çox aktual və lazım olan bir keyfiyyət kimi yüksək dəyər qazanıb. Doğrudan da, pedaqoji prosesi quran müəllimin özünəməxsus bir qeyri-adiliyi, emosional ifadə tərzi olmalıdır. Başqa sözlə, onun fəaliyyətində bir emfotika hiss edilməlidir. Bu, pedaqoji mühitin gərginliyini götürən, ona yumşaqlıq gətirən xüsusiyyətdir. Bu gün də həmin xüsusiyyətlər öz lazımlığını itirməmişdir. Fikrimizcə, onun elementlərindən istifadə edilməlidir. Lakin bu gün müəllim

üçün ən əsas prioritet keyfiyyət onun tədqiqatçılığı, araşdırmalar aparması, onu özünün fəaliyyətinin əsasına gətirə bilməsidir.

Məlum olduğu kimi, hökumətin qəbul etdiyi "Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları (kurikulumları)" sənədində təhsilverənlərin keyfiyyətləri sadalanarkən göstərilir ki, onlar "əməkdaşlıq, tədqiqatçılıq, özünütəhsil və idarəçilik bacarıqlarına" malik olmalıdırlar. Göründüyü kimi, tədqiqatçılıq müəllim üçün zəruri keyfiyyətlərdən hesab olunur. O, müasir şəraitdə bütün fəaliyyətini tədqiqatçılıq üzərində qurmaqla həyata keçirir. Çünki nəticəyönümlü təhsil sisteminin qurulduğu bir zamanda bütün strateji fəaliyyətlərin müəyyənləşdirilməsində və reallaşdırılmasında müəllimə sərbəstlik verilir. Bu zaman o, bütün potensial imkanlarını, eləcə də işlədiyi şəraiti, əhatə olunduğu təhsil mühitini nəzərə almaqla zəruri resurslarını toplayır, işini planlaşdırır və onun həyata keçirilməsi üçün həlledici addımlarını müəyyənləşdirir. Bunları lazımi səviyyədə yerinə yetirmək üçün müəllim hökmən tədqiqatçılıq bacarığına yiyələnməlidir. Onda seçmə, toplama, ümumiləşdirmə, analiz, sintez kimi təfəkkür qabiliyyətləri olmalıdır. Ən başlıcası, faktlar əsasında müqayisələr aparmaqla hökm vermək, müvafiq qərar qəbul etməyi bacarmalıdır. Yeri gəlmişkən, qeyd etmək lazımdır ki, bəzən müəllimin öz fəaliyyəti barədə perspektiv, yaxud cari planlaşdırma aparmaqda çətinlik çəkməsi ilə rastlaşmalı oluruq. Yaxud özünün bütöv bir dövr üçün fəaliyyət istiqamətlərini təsəvvür edə bilməyən, lakin işlərini icra etməkdə israrlı olan müəllimlər də tapılır ki, fikrimizcə, belələri tədqiqatçılıqdan xeyli uzaqda olan müəllimlərdir. Heç şübhəsiz, məktəblərimizdə belə müəllimlər haqqında konkret məlumatların olması, onların inkişafı barədə tədbirlərin müəyyənləşdirilərək reallaşdırılması təxirəsalınmaz vəzifə hesab edilir.

Müasir müəllim klassik təcrübəyə söykənməklə, eləcə də qabaqcıl təcrübələr əsasında işini qurmaqla yanaşı, həm də zamanın müasirlik aynasında özünü görə bilməli, istiqamətlərini müəyyənləşdirməyi bacarmalıdır. Təcrübələr göstərir ki, bəzi müəllimlər ənənənin, eləcə də klassikanın sehrinə düşərək özünə qapanır. Bəzən qabaqcıl və təcrübəli hesab etdiyimiz müəyyən müəllimlərdə bu, təkəbbürə çevrilir, onda bəyənməzlik kimi neqativ bir keyfiyyət əmələ gəlir. Belə müəllimlər bütün yeni zamanlarda bu cür mühafizəkarlıq göstərir, yenini yaxınlarına buraxmırlar.

Müasir müəllim təhsil texnologiyalarına münasibətdə açıq siyasət yeritməli, onları saf-çürük etməklə təfəkkür süzgəcindən keçirməli, zəruri olduğu halda fəaliyyətinə gətirməli, mümkün olmayanları hazırladığı məlumat bankına daxil etməlidir. Qarşılıqlı əməkdaşlıq şəraitində həmin materialları müəllim yoldaşları ilə müzakirə etməyi bacarmalıdır.

Təbii ki, müəllim üçün sadaladığımız bu keyfiyyətlər öz-özünə formalaşmır. Onlar, birinci növbədə, ilkin müəllim hazırlığı mərhələsində tələbələrə aşılanır. Gələcəyin peşəkar müəllimi kimi onlara bu xüsusiyyətlər öyrədilir. Belə olan təqdirdə ilkin müəllim hazırlığı necə qurulmalıdır? Fikrimizcə, son dərəcə çox ümumi xarakter daşıyan bu sualın cavablandırılmasında xeyli şərtləri sadalamaq olar. Lakin onlardan başlıca olaraq ikisi daha çox didaktik əhəmiyyəti ilə fərqlənir. Onlardan birincisi, məzmun, ikincisi isə texnologiyalar amilidir.

Təhsildə məzmun özül rolunu oynamaqla, demək olar ki, təhsilin bütün problemlərindən özünün həlledici rolu ilə fərqlənir. Son psixoloji araşdırmalarda qeyd olunur ki, "Müasir təhsil konsepsiyası təlimin məzmununu şəxsiyyət kontekstində təhlil edir, onu şagird şəxsiyyətinin inkişafı vasitəsi kimi dəyərləndirir" [3]. Analoji olaraq belə nəticəyə gəlmək olur ki, ilkin müəllim hazırlığında təhsilin məzmununa, parametrinə ciddi yanaşmaq, ilk növbədə, onu inteqrasiya müstəvisində həll etmək lazımdır. Bu, ilk növbədə, müəllim üçün kompetensiyaların (səriştələrin) müəyyənləşdirilməsi ilə nəticələnəcəkdir. Həmin proses müəllim şəxsiyyətinin formalaşdırılmasında praktik əhəmiyyəti olmayan fənlərin sıradan çıxmasına, zəruri olanlarının isə məqsədəmüvafiq qaydada saxlanmasına gətirib çıxaracaqdır. Eyni zamanda müəyyən olunmuş fənlər üzrə standartların hazırlanması ilə başa çatacaqdır. Çünki müasir dövrdə xarakterik olan nəticəyönümlü təhsil üçün ən önəmlisi tələbələrin bilik və bacarıqlarına qoyulan səviyyələrdir ki, bu səviyyələrin reallaşdırılması üçün həm təhsilalan, həm də təhsilverən fəndən bir vasitə kimi istifadə etməli olur.

Beləliklə, müasir müəllimin keyfiyyətləri standartlarda ifadə edilir və pedaqoji prosesdə də reallaşdırılan həmin standartlar olur. Müxtəlif dərslik, dərs vəsaiti və digərləri sadəcə vasitə kimi istifadə edilir.

İlkin müəllim hazırlığında müəllim şəxsiyyətinin formalaşdırılmasına həm də öz növbəsində müasir ruhda qurulan və yeni parametrlərlə həyata keçirilən pedaqoji proses də təsir edir. Başqa sözlə, dərs, istifadə olunan təlimin təşkilat formaları da tələbələrin görüb-götürdüyü mənbə kimi didaktik əhəmiyyət daşıyır. Ona görə də dərsin maraqlılığı, stimullaşdırıcı, eləcə də inkişafetdirici xarakterləri daim diqqət mərkəzində saxlanılmalı, onların çevik və dinamik olmasına diqqət yetirilməlidir. Təcrübələr göstərir ki, dərsin sxematikliyi, yeknəsəqliyi onun təlim effektinə xələl gətirir. Tələbələrə yorucu təsir bağışlayır. Xüsusən müasir texnologiyalardan istifadə olunmaması onu quru və yorucu edir. Yüksək səviyyədə qurulmuş pedaqoji ünsiyyət, pedaqoji konflikt, pedaqoji qiymətləndirmə kimi yeni pedaqoji texnologiyaların təlim prosesinə gətirilməsi onun nümunəvi rolunu gücləndirir.

Biz Fasiləsiz Pedaqoji Təhsil üzrə Koordinasiya Şurasında ardıcıl və davamlı olaraq bu problemlər ətrafında müzakirələr aparır, gələcəyin müəllim kadrlarının seçilməsi, formalaşdırılması və inkişaf etdirilməsi istiqamətində təkliflər hazırlayırıq. Həmin təkliflərin həyata keçirilməsi üçün uyğun strategiya və texnologiyalar tövsiyə edirik.

XXI əsrin ilk on ili onu göstərdi ki, müəllim haqqında əsrin meqameyilləri əsasında daha ciddi düşünməli, onun hazırlanmasına gələcəyin prizmasından baxmaqla qərarlar verməliyik. Bu istiqamətdə çoxlu vəzifələrimiz olduğu kimi, bəzi təxirəsalınmaz genişmiqyaslı işlərimiz də vardır ki, heç şübhəsiz, onların yerinə yetirilməsində səylərimizi birləşdirməli, müəllim hazırlığı sahəsində daha böyük uğurlar qazanmaq üçün səfərbər olunmalıyıq.

**İstifadə edilmiş ədəbiyyat**

Azerbaijan School, Volume 320, Issue 1, pp.35-48, 2013

1. “Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının Konsepsiya və Strategiyası”. www.edu. gov.az – Qanunvericilik, Konsepsiyalar.

2. Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları (kurikulumları). “Kurikulum” jurnalı, 2010, №3.

3. Əlizadə Ə. Yeni pedaqoji təfəkkür. Bakı, “Adiloğlu”, 2001.